UOT 633. 511; 631, 15

# TƏDQİQATÇI-FERMER MÜNASIBƏTLƏRİ DAVAM EDİR

**M.A.VƏLİYEVA, K.Ə.QASIMOVA, E.F.MƏMMƏDOVA, G.B.ABBASOVA**
**AKTN Bitki Mühafizə və Texniki Bitkilər ET İnstitutu**

*Pambıqçılığın inkişafi yeni sortların və müsbət nəticəli tədqiqatların istehsalata tətbiqi ilə sıx surətdə bağlıdır. 2010-cu ildən başlayaraq 2017-ci il də daxil olmaqla BM və TBETİ-nun əməkdaşları digər təşkilatlar və pambıqçılıq bölgələrinin icra strukturları ilə birgə elmi-praktik seminarlar təşkil etmələrinin səbəb və nəticələri göstərilmişdir. Tətbiqə keçirilmiş bütün mövzular nümayiş etdirilmiş, dəvət olunmuş fermerlərə göstərilərək öz gözləri ilə görə biləcəyi yeni texnologiyaya yiyələnməsinə xidmət etməsindən bəhs olunur.*

**Açar sözlər:** *pambıq bitkisi, fermer, seleksiya nailiyyətləri, tətbiq, sort, tarla günləri, ozonlaşma texnologiyası, irriqasiya.*

Geniş əhatəli xalq təsərrüfatı əhəmiyyəti olan pambıq bitkisi interval texniki bitkidir. 70-80-ci illərdə Azərbaycanın iqtisadiyyatında bu bitkinin xüsusi rolu olmuşdur. İnsanların yaşayış səviyyəsi yüksəlmiş, kənddə işsizlik problemi həll olunmuşdur. Ədəbiyyat mənbələrinə Respublikamızın ərazisində pambıqçılıqla hələ eramızdan əvvəl IV-VI əsrlərdə məşğul olunması haqqında məlumat var. Yəni ölkənin yerləşdiyi iqtisadi-coğrafi məkan, onun torpaq iqlimi şəraiti bu bitkinin əkilib becərilməsinə uyğundur.

Pambıq bitkisinin bioloji xüsusiyyətləri, onun ətraf mühit amillərinə tələbatı ilə əlaqədar yer kürəsinin az bir hissəsində (orta hesabla ≈ 32-33 ml.ha) əkilib becərilir. Yəni onun bioloji xüsusiyyətləri istənilən yerdə, istənilən həcmdə becərilməsinə imkan vermir. Pambıq bitkisi üçün qısa günlü, dolğun günəşli, isti, rütubətli iqlimli, 220-250 şaxtasız günləri olan regionlar əlverişli hesab olunur.

Bu gün xalq təsərrüfatının elə bir sahəsi yoxdur ki, oradan pambıqdan alınan məhsullardan istifadə olunmasın. Hər şeydən öncə pambıq geyim, paltar, qiymətli ərzaq və qüvvəli yemdir. Bir ton pambıq 3500 $m^2$ parça, 112 kq yağ, 10 kq sabun, 270 kq jmıx, 170 kq çiyid qabığı-şeluxa və onlarla digər sahələrdə istifadə olunan əlavə xammal alınır. Ona görə də dünya bazarına pambıq lifinə və digər məhsullarına çörək, metal enerji və s. ilə bərabər nəzarət edilir. Bu bitkinin əsas məhsulu sayılan pambıq lifinə toxuculuq sənayesi üçün əsas, əvəzolunmaz təbii xammal olaraq dünya bazarında böyük tələbat olduğuna görə strateji əhəmiyyət daşıyır.

Bu sahənin əsaslı inkişafı hələ Sovetlər birliyi dövründə 60-80-ci illərə təsadüf edir. Lakin onun əsl inkişafı keçən əsrin 70-ci illərinin əvvəlindən başlamışdır. Ulu öndər H.Əliyev pambıqçılıqda yaranmış böhrandan çıxmağın əsas rolunu aqrar elmin nailiyyətlərinin istehsalata tətbiqində görünmüşdür. O, yüksək məhsuldarlıq potensialına malik xəstəlik və zərərvericilərlə davamlı yeni pambıq sortlarının və toxum materialının yaradılmasının toxumçuluq işinin elmi əsaslarla qurulması, mütərəqqi texnologiyaların işlənib hazırlanması ilə əlaqədar aqrar elmi qarşısında mühüm vəzifələr qoyulur [1]. Bunun nəticəsi idi ki, H.Əliyevin Azərbaycan Kommunist Partiyasına rəhbərlik etdiyi 1969-1982-ci illərdə pambıqçılığın dinamik və sabit inkişafı təmin edilmişdir.

Bundan sonra ölkədə ictimai iqtisadi quruluşun dəyişməsi, bütün sahələrdə olduğu kimi pambıqçılıq sahəsinin də tənəzzülə uğramasına səbəb oldu. Bu proses Azərbaycanın müstəqillik qazandıqdan sonra üzləşdiyi 10-12 illik keçid dövrünə təsadüf edir. Müstəqillik qazanmış ölkəmizin əhalisinin ərzaq təhlükəsizliyini təmin etmək istiqamətində həyata keçirdiyi dövlət proqramı ilə əlaqədar kənd təsərrüfatının prioritet istiqamətləri dəyişdi. Yəni pambıq əkin sahələri azaldılaraq, yerinə dənli taxıl bitkiləri, meyvə-tərəvəz, yeni bitkilər əkilməyə başladı. Bu azalma aqrar istehsalatdan sonra bir qədər də dərinləşdi. Pambıq istehsalının azalma səbəblərindən biri də kənd təsərrüfat texnikası və avadanlığının əmlak payı kimi bölüşdürülməsi olmuşdur. Pambıq istehsalının kəskin azalma səbəblərindən biri də xam pambığın daimi və sabit bazarı sayılan pambıq emalı müəssisələrinin monopodiyalarda birləşməsi və məhsulun satınalma qiymətlərinin aşağı olmasıdır. Bu amillər pambıqçılığın sabit və dayanaqlı inkişafını təmin edə bilməz. Bütün bunlara baxmayaraq sabiq Az ETPİ-nin tədqiqatçı alimləri pambıq bitkisi ilə aparılan tədqiqat işlərini bir gün belə dayandırmadan yeni sortlar və yeni texnologiyalar almaqla informasiya və elmi nəticələrin tətbiqi şöbəsi vasitəsilə pambıqçılıq bölgələrində sərgi əkinləri adı ilə tətbiqini həyata keçirmişdir. Nümayiş əkinlərinin müxtəlif torpaq iqlim şəraitinə uyğun torpaq mülkiyyətçisinin sahəsində keçirilməsi həmin ərazidə olan fermerlərin yeni təcrübə və texnologiyaların mənimsənilməsində, onların elmi dünya görüşlərinin formalaşmasında əməli bir vasitədir. Elmi nailiyyətlərin tətbiqi seminar günü nümayiş etdirilir. Tarla günlərinin təşkili fermerlərin sadəcə nümayiş

tarlasına toplanmasından ibarət deyil. Məhsul istehsalçısı olan fermer gözü ilə görüb inanmalıdır ki, institut tərəfindən təklif olunan yeni texnologiya və sortların tətbiq edildiyi sahədən alınan məhsul, onların xaricdən gətirib əkdiyi toxumdan çox məhsuldardır. Bununla bərabər heç bir şeyə nail olunmamış, əksinə xaricdən gətirilmiş, yerli torpaq iqlim şəraitinə uyğun olmayan, gecyetişən, səpinə yararlıq göstəriciləri tələbata uyğun olmayan, sortları gətirib əkməklə çox böyük ziyana uğramış, 6 ay pambıq əkinlərində çalışmaqla nəticədə bir manatın sahibi olmamışlar. Yayımla məşğul olan bir şöbə kimi səsimiz heç bir yerə çatmamış, hətta "pambığı artıq ləğv edirik" deyənlər də olmuşdur.

2016-cı il 17 sentyabr tarixində uzun fasilədən sonra ölkə prezidenti cənab İ. Əliyevin sədrliyi ilə Sabirabad şəhərində pambıqçılığın inkişafına dair keçirdiyi fəallar yığıncağında respublikanın 24 rayonunda 51 min hektar sahədə pambıq əkiləcəyi, yığıncaq iştirakçılarının nəzərinə çatdırılmışdır. Bu tapşırıq çox uğurla yerinə yetirilmiş 90 min tona yaxın məhsul əldə olunmuş, hektarın orta məhuldarlığı 17 s/ha təşkil etmişdir. Ölkə prezidentinin belə bir addım atması uzun müddətdən bəri yaddaşlardan silinmək üzrə olan pambıqçılığın inkişaf etdirilməsi üçün sanki bir tramplin rolunu oynadı. Həmin andan etibarən bütün dövlət orqanlarında, nazirliklərdə, bu bitkinin inkişaf etdirmək planları işlənildi. Pambığın satınalma qiyməti artırıldı, bu işlə məşğul olan fermerlərə dövlət dəstəyi nəzərdə tutuldu.

Növbəti il yəni 28 mart 2017-ci il tarixdə Saatlı şəhərində cənab prezident İ. Əliyevin sədrliyi ilə keçirilən fəallar yığıncağında republikanın 22 rayonunda 136 min hektar sahədə pambıq bitkisi əkiləcəyi və həmin sahələrin hektardan ən azı 20 s/ha məhsul alınmaqla, 270 min ton pambıq istehsal olunması tapşırığı verilmişdir.

Ölkə prezidentinin çıxışından irəli gələn bu müddəaların həlli istiqamətində atılan addımlar tezliklə Azərbaycanda pambıqçılığın əvvəlki, şöhrətinin bərpa olunmasından xəbər verir. Yəni pambıqçılığın dirçəlməsi üçün yeni bir dövr açılır.

BM və TBETİ-nin hazırladığı yeni becərmə texnologiyaları və yaradılmış pambıq sortlarının pambıqçılğın müxtılif sahələrinə aid istər fundamental, istərsə də tətbiqi xarakterli tədqiqatların nəticələrinin tətbiqinin təbliğini müxtəlif pambıqçılıq bölgələrində elmi-praktik seminarlar keçirməklə elmi nailiyyətlərin tez yayılmasını təmin etməyə çalışdıq. Bu məqsədlə sortlara və yeni texnologiyaya aid tövsiyələr, bukletlər, kitabçalar, məsləhət vərəqləri hazırlanmış sərgi əkinlərinin nümayişi üçün keçirilmiş elmi-praktik seminarlarda fermerlərə paylanmışdır. Nümayiş əkinlərinin müxtəlif torpaq iqlim şəraitinə uyğun torpaq mülkiyyətçisinin sahəsində keçirməklə, həmin ərazidə olan fermerlərin yeni təcrübə və texnologiyanın mənimsənilməsində əməlli bir vasitə kimi rolu yüksəkdir. Elmi nailiyyətlərin tətbiqinə aid olan nümayiş əkinləri hər il institutun rəhbərliyi tərəfindən seçilərək Azərbaycan respublikası Kənd Təsərrüfat Nazirliyi Aqrar Elm İnformasiya Məsləhət Mərkəzinin baş direktoru tərəfindən təsdiqləndikdən sonra icra olunmaq üçün, İnformasiya təminatı və elmi nəticələrin tətbiqi şöbəsinə verilir. Kiçik torpaq sahələri olan kəndli-fermer təsərrüfatında qabaqcıl təcrübə və texnologiyaların yeni elmi nəticələrin tətbiqi vasitəsilə vahid sahədən yüksək məhsul alınmasına təsir edən həqiqi nəticələri fermerlərə göstərməklə onların bilik və təcrübələrini artırmış oluruq.

2010-cu ildən 2016-cı ilə qədər respublikanın pambıqçılıq bölgələrində BM və TBETİ-i tərəfindən 45 mövzu tətbiqə verilərək nümayişi keçirilmişdir. Nümayiş zamanı fermerləri maraqlandıran suallar cavablandırılmış, onların toxuma olan tələbatı təmin olunmuşdur.

2016-ci ildə BM və TBETİ-nin Gəncə RAEİMM-lə birgə təşkil etdiyi "Tarla günləri" elmi- praktik seminarı 11.08.2016-cı ildə baş tutdu. Seminarda KTN-nin məsul işçiləri, Aqrar Elm İnformasiya Məsləhət Mərkəzinin baş direktoru prof. R.Balayev iştirak etmişdir. Prof. R.Balayevin sədrliyi ilə keçirilən seminarda 79 nəfər iştirak edirdi. Gündəlikdə 3 məsələ qoyulmuşdur: 1. Üzüm, şəkər çuğunduru soya bitkilərinin xəstəlik və zərərvericilərindən mühafizə tədbirlərinin təşkili;

2. Üzüm bitkisinin mütərəqqi becərmə texnologiyası; 3. Şəkər çuğunduru və soya bitkisinin optimal aqrotexnologiyası.

Tədbirdə Gəncə-Qazax bölgəsinin fermerləri və aqrar sahənin əməkdaşları iştirak edirdi. Elmi diskusiya şəklində keçən tədbirdə fermerlərə mövzuları və sortları əhatə edən bukletlər paylandı, sonra tarlada mövzuların əkin sahələrinə baxış keçirildi.

Növbəti "Tarla günləri" adlı elmi-praktik seminar 06.09.2016-cı il tarixdə Beyləqan rayon Mil Təcrübə Stansiyasında keçirilmişdir. Seminara Beyləqan və ətraf rayonun fermerləri dəvət olunmuşdur. Seminarda 48 nəfər iştirak edirdi. Seminara BM və TBETİ-nin direktor əvəzi S.F.Cabbarov sədrlik edirdi. Gündəlik məsələ: 1. Rayonlaşmış aborigen pambıq sortları; 2. Pambıq əkinlərində suya qənaətedici suvarma rejimi və irriqasiya eroziyasının azaldılması yolları.

Hər iki mövzunun tətbiqi tarlada ayrıca səpilmiş, etiketlənmiş və seminar iştirakçılarına nümayiş etdirilmişdir.

Növbəti elmi-praktik seminar 20.08.2016-cı il tarixdə Tərtər RAEİMM-də keçirilmişdir. Seminarda Tərtər və ətraf rayonun fermerləri cəmi 43 nəfər iştirak edirdi. Seminara BM və TBETİ-nin direktor əvəzi S.F.Cabbarov sədrlik edirdi. Gündəlikdə 2 mövzu vardı: 1. Rayonlaşmış aborigen pambıq sortları və Pambıq tarlalarında erkən payızda əkilmiş, dənli-paxlalı bitkilərin torpağın münbitliyinə və pambığın məhsuldarlığına təsiri. Seminar çox yüksək elmi-diskusiya şəraitində keşmiş, sonda tətbiqə verilmiş

mövzuların əkin sahələrinə baxış keçirilmiş, fermerlərə mövzuya və 8 sorta aid bukletlər paylanmışdır.

Növbəti elmi-praktik seminar 23.09.2016-cı il tarixdə Gəncə RAEİMM-də keçirilmişdir. Azərbaycan KTN AEİMM-nin baş direktoru prof. R.Balayevin sədrliyi ilə keçirilən seminarda 83 nəfər iştirak edirdi. Seminarda pambıq bitkisinin mütərəqqi becərmə texnologiyaları, xəstəliklərin və zərərvericilərin mühafizəsi üzrə inteqrir mübarizə tədbirləri, baramaçılıq və arıçılıq sahəsində əldə olunan elmi nailiyyətlər mövzusunda məruzələr olunmuş mütərəqqi texnologiyalara sahədə baxış keçirilmişdir.

10.10.2016-cı il tarixdə BM və TBETİ ilə Gəncə RAEİMM-nin birgə təşkil etdiyi növbəti elmi-praktik seminar Şəmkir rayonunda Sabirkənddə, Gəncə-Qazax iqtisadi bölgəsində kartofun yeni texnologiya üzrə becərilməsinin əsasında başlıca zərərvericilərə qarşı inteqrir mübarizə tədbirlərinin hazırlanmsı mövzusunda keçirilmişdir. 52 nəfərin iştirakı ilə keçirilən seminara BM və TBETİ-nin direktor əvəzi S.F.Cabbarov sədrlik etmişdir. Keçirilən bütün seminarlarda fermerlər mövzularla çox maraqlanmış, onların rastlaşdıqları problemlərə aydınlıq gətirilmiş, toxum sifariş edilmişdir.

2017-ci ildə beş pambıqçılıq bölgəsində nümayiş əkinləri keçirilməsi planlaşdırılmışdır. İlk elmi-praktik seminar 30.08.2017-ci il tarixdə Beyləqan rayon Mil Təcrübə Stansiyasında keçirildi. Mil TS-da 2 mövzu tətbiqə çıxarılaraq nümayiş etdirildi: 1. Rayonlaşmış aborigen pambıq sortları; 2. Pambıq əkinlərində suya qənaətedici suvarma rejimi və irriqasiya eroziyasının azaldılması yolları.

Seminara BM və TBETİ-nin direktor əvəzi S.F.Cabbarov sədrlik edirdi. Seminarda Beyləqan və ətraf rayonların fermerləri (52 nəfər) iştirak edirdi. Fermerlər nümayiş etdirilən mövzulara tarlada baxıb öz qeydlərini etdikdən sonra tarlada təşkil olunmuş çay süfrəsi arxasında müzakirələr davam etdirilmışdir.

Yüksək səviyyədə təşkil olunmuş elmi-praktik seminarda BM və TBETİ-nin 7 nəfər alimi sort və mövzu müəllifləri iştirak edirdi. Çıxışlar bitdikdən sonra fermerləri maraqlandıran suallar cavablandırılmışdır. Elmi-praktik seminarın gedişi Az.TV vasitəilə yayımlanmış, AzərTac-da məlumat getmişdir.

Növbəti elmi-praktik seminar 07.09.2017-ci il tarixdə Salyan rayonunda keçirilmişdir. Seminar Azərbaycan Kənd Təsərrüfat Nazirliyi Aqrar Elm və İnformasiya Məsləhət Mərkəzilə BM və TBETİ ilə birgə təşkil olunmuş, seminarda122 nəfər iştirak edirdi. Salyan və ətraf rayonun fermerlərinin iştirakı ilə keçən seminara BM və TBETİ-nin direktor əvəzi S.F.Cabbarov sədrlik edirdi. Gündəlik əsas 2 məsələ: 1. Ozonlaşma texnologiyasının pambıq sortlarının toxumuna təsiri nəticəsində təsərrüfat qiymətli əlamətlərin öyrənilməsi; 2. Rayonlaşmış aborigen pambıq sortları mövzusu qoyulmuşdur.

Seminarda Milli Aviasiya Akademiyasının Konstruktor bürosunun rəisi t.e.d., prof., əməkdar elm xadimi Telman Niyazov "Ozonlaşma texnologiyasının aqrar sahədə əhəmiyyəti" haqqında əhatəli məruzə etmişdir.

Seminarda iştirak edən Torpaqşünaslıq və aqrokimya institutunun direktoru a.e.d. Ə.Quliyev, həmin institutun şöbə müdiri a.e.d., əməkdar elm xadimi P.Zamanov, aparıcı elmi işçi a.e.f.d. Ə.Əlizadə, BM və TBETİ-nin şöbə müdiri a.e.a.a.d.Ə.Tağıyev, Salyan RAEİMM-in direktoru S.İbrahimov, Salyan rayon KTİ-nin rəisi T.Atamalıyev, BM və TBETİ-nin şöbə müdiri a.e.f.d. K.Hüseynov seminarın işinə aid geniş məruzələrlə çıxış etmişlər. Bundan sonra seminar iştirakçıları tarlada nümayiş əkinlərinə baxış keçirilmiş, fikir mübadiləsi etmişlər. Seminarın gedişi ARB və SPEYS telekanalı vasitəsilə yayımlandı. Həmin gün seminar Salyan rayonunda öz işini başa çatdırdı.

20.09.2017-ci il tarixdə BM və TBETİ ilə Gəncə RAEİMM-lə birgə təşkil etdiyi seminarda 56 nəfər iştirak edirdi. Seminara Gəncə RAEİMM-in direktor əvəzi Y.Ağayev sədrlik etmişdir. Gündəlikdə 2 mövzu tətbiq edilərək nümayiş etdirilmişdir. Azərbaycan pambıqçılığında yerli sortların əhəmiyyəti və Pambıq bitkisinin bar orqanlarının tökülmə dərəcəsinə xarici şərait amillərinin və aqrotexnikanın becərmə komponentlərinin təsiri. Seminara dəvət olunmuş Gəncə və ətraf rayonun fermerləri tarlada tətbiq olunan hər iki mövzunun əkinlərinə baxış keçirərək fikir mübadiləsi etmişlər. Həmin gün seminar öz işini Gəncədə başa çatdırdı.

Artıq 10 ildir ki, biz BM və TBETİ olaraq alimlərin işlədiyi müsbət nəticəli tədqiqatları və rayonlaşmış yeni pambıq sortlarını tətbiq etməklə, nümayiş etdirib fermerləri maarifləndirməyə çalışır, tədqiqatçı-fermer münasibətlərini inkişaf etdirməyə davam etdiririk. Belə elmi-praktik seminarlardan sonra fermerlərin institutun yartdıqları yerli sortlara maraqları artır, həmin sortların toxumlarına tələbat göstərirlər.

**ƏDƏBİYYAT**

**1.** İrşad Əliyev-Heydər Əliyev və Azərbaycan Kənd Təsərrüfatı. Azərbaycan Dövlət Nəşriyyatı, Bakı, 1997, 150 səh.

**Продолжаются исследователь - фермерские отношения**

**М.А.Валиева, К.А.Касумова, Э.Ф.Мамедова, Г.Б.Аббасова**

Развитие хлопководства тесно связано с внедрением в производство новых сортов и исследований с положительными результатами. В статье говорится о цели и результатах научно-практических семинаров, организованных начиная с 2010-го, включая 2017-ой год, сотрудниками НИИ ЗРТК совместно с другими организациями и исполнительными структурами хлопкосеющих регионов. Демонстрированы все внедряемые темы, которые открывают возможности для прочного усваивания существующих новых технологий.

***Ключевые слова:*** *хлопчатник, фермер, селекционные достижения, внедрение, сорт, полевые дни, технология озонизации, ирригация.*

**Researcher – farmer relations are continued**

**M.A.Valiyeva, K.Ə.Qasımova, E.F.Mammadova, G.B.Abbasova**

Development of cotton-growing is closely related with introduction of new grades and researches with positive results into production. There is spoken about reasons and results of conduction of scientific-practical seminars accomplished beginning from 2010 including 2017 by collaborators of PP and ICSR Institute together with other organizations and execution structures of cotton-growing regions. All of the introducted themes are demonstrated and recommendations for utilization of new technologies are presented.

***Key words:*** *cotton plant, farmer, selection achievements, introduction, grade, field days, ozone technology, irrigation.*

